

## AZƏRBAYCAN RESPUBLİKASININ DÖVLƏT HİMNİ

Musiqisi *Üzeyir Hacıbəyovun*,
sözləri *Əhməd Cavadındır.*

Azərbaycan! Azərbaycan!
Ey qəhrəman övladın şanlı Vətəni!
Səndən ötrü can verməyə cümlə hazırız!
Səndən ötrü qan tökməyə cümlə qadiriz!
Üçrəngli bayrağınla məsud yaşa!

Minlərlə can qurban oldu!
Sinən hərbə meydan oldu!
Hüququndan keçən əsgər,
Hərə bir qəhrəman oldu!

Sən olasan gülüstan,
Sənə hər an can qurban!
Sənə min bir məhəbbət
Sinəmdə tutmuş məkan!

Namusunu hifz etməyə,
Bayrağını yüksəltməyə
Cümlə gənclər müştaqdır!
Şanlı Vətən! Şanlı Vətən!
Azərbaycan! Azərbaycan!

*Zahid QARALOV*
*Əlövsət OSMANLI*
*Fikrət SÜLEYMANOĞLU*
*Vüqar MƏMMƏDOV*

# HƏYAT BİLGİSİ

## 2-ci sinif

Azərbaycan Respublikası Təhsil Nazirliyi tərəfindən təsdiq olunub (05.08.2005-ci il tarixli 616 №-li əmr)

*Sinif* __________
*Soyadı* __________
*Adı* __________



*Elmi redaktor*: Pedaqoji elmlər doktoru, professor **Y.Kərimov**

*Məsul redaktor*: **İ.Akifqızı**

*Rəyçilər*: Psixologiya elmləri doktoru, professor **Ə.Əlizadə**
Pedaqoji elmlər doktoru, professor **Ç.Bədəlov**
Pedaqoji elmlər doktoru, professor **Ə.Hüseynov**
Yasamal TŞ-nin müdir müavini **F.Həmzəyev**



Qaralov Z., Osmanlı Ə., Süleymanoğlu F., Məmmədov V. **Həyat bilgisi** (2-*ci sinif*). —Bakı: Pedaqogika, 2005. —104 səh.

Q $\frac{4306020000-066}{057-05}$





**Övladlarını sağlam, bilikli və tərbiyəli böyütmək ailənin və dövlətin birinci dərəcəli işidir.**

**HEYDƏR ƏLİYEV**

## ƏZİZ MÜƏLLİMLƏR!

Bildiyiniz kimi, ötən dərs ilindən başlayaraq, ümumtəhsil məktəblərinin I sinfində "Ətraf aləmlə tanışlıq" kursunun tədrisi "Həyat bilgisi—1" kitabı əsasında aparılır. II sinifdə isə şagirdlər həmin kursu "Həyat bilgisi—2" kitabı ilə davam etdirəcəklər. Bu vəsaitlə şagirdlər I sinifdə öyrəndikləri mövzuları daha da genişləndirməklə yanaşı, yeni mövzularla da tanış olacaqlar.

Vəsait üzrə aparılacaq işi daha da səmərəli qurmaq üçün aşağıdakı məqamlara diqqət yetirməyi məqsədəuyğun hesab edirik:

**1.** Hər bir dərsin əvvəlində **"İnteraktiv suallar"** verilir. Həmin sualların köməyilə şagirdlərin mövzuya aid ilkin bilgiləri üzə çıxarılır. Bunun üçün 8–10 dəqiqə vaxt ayırmaq olar. Sonra bu bilgilər kitabda verilmiş mətn əsasında dəqiqləşdirilir, daha da genişləndirilir və dərinləşdirilir. Dərsin sonunda **"Yoxlama sualları"**nın köməyilə şagirdlərin mövzunu mənimsəmə səviyyəsi müəyyənləşdirilir.

**2.** Mövzuların sonunda verilmiş **"Çalışmalar"**ı şagirdlər evdə valideynlərinin nəzarəti altında yerinə yetirməlidir. Bununla da mövzuların mənimsənilməsində valideynlərin iştirakı da təmin olunur.

**3.** Nisbətən çətin mövzular * işarəsi ilə fərqləndirilib. Bu mövzuların tədrisi zamanı sinfin səviyyəsinə uyğun korrektələr edilə bilər.

**4.** 27-ci dərsin mətni nümunə xarakteri daşıyır. Bir kəndin (İlisu) timsalında verilmiş mətni şagirdlərin yaşadıqları yer haqqında məlumatları əks etdirən mətnlə əvəz etmək tövsiyə olunur.

*Müəlliflər*



I

bölüm





# MƏKTƏBƏ DÖNÜŞ. DAVRANIŞ QAYDALARI




# 1-ci dərs — *Bilik günü. Məktəbə dönüş.*

**İNTERAKTİV SUALLAR**



1. Tətilin əhəmiyyəti nədir?
2. Yay tətilini harada və necə keçirmisiniz?
3. Yeni dərs ilinə necə hazırlaşmısınız?
4. Məktəbdəki davranış qaydaları haqqında nələri bilirsiniz?




**A** Yay tətili sona çatdı. Yeni dərs ili başlandı.

Səhər tezdən yuxudan oyandım. İdman edib yuyundum. Yeməyimi yedikdən sonra çantamı götürüb anamla məktəbə yollandım.

Bu gün Bilik günüdür. Məktəbimizin həyəti şagirdlər, valideynlər və müəllimlərlə doludur. Hər yanda bayram əhval-ruhiyyəsi var. Hamı deyib-gülür, bir-birini təbrik edir. Çox həyəcanlıyam. Müəllimim və sinif yoldaşlarımla görüşürəm. Mən onlar üçün çox darıxmışdım.



**B** Birinci sinifdə yaxşı oxumaq, biliklərə yiyələnmək üçün çox çalışmış, yorulmuşduq. Yorğunluğumuzu yay tətilində istirahət etməklə çıxardıq.

Mən tətilimi Qubada babamgildə keçirdim. Tətildə müəllimimin məsləhət gördüyü kitabları oxudum. Birinci sinifdə «Həyat bilgisi» kitabından öyrəndiklərim əsasında müşahidələr apardım. Müşahidə gündəliyimdə çoxlu qeydlər etmişəm:

— *gecələr otların, yarpaqların üstünə şeh düşür;*
— *qaranquş göydə uça-uça cücüləri tutur;*
— *tısbağa ot yeyir;*
— *qurbağa həm suda, həm də quruda yaşayır;*
— *soxulcan güclü yağışdan sonra torpağın üstünə çıxır.*

Müəllim müşahidə gündəliyimi oxuyub xoş sözlər dedi. Məni yoldaşlarıma nümunə göstərdi.



**YOXLAMA SUALLARI**

1. Oxumağı və yazmağı bilməyən adam hansı çətinliklərlə üzləşə bilər?
2. «Biliksiz adam meyvəsiz ağac kimidir» sözlərinin mənası nədir?
3. Həyat bilgilərinizi artırmaq üçün dərslikdən başqa daha nələrdən istifadə edirsiniz?



# ÇALIŞMALAR



Doğru cavabı qeyd edin.

**1.** Məktəbə nəyə görə gedirlər?
A) Uşaqlarla oynamaq üçün
B) Biliklərə yiyələnmək üçün
C) Müəllimlərlə görüşmək üçün

**2.** Müəllim sinfə daxil olanda nə etmək lazımdır?
A) "Buyurun!" demək
B) Ayağa qalxmaq
C) "Xoş gəldiniz!" demək

**3.** Müəllimin sualına cavab vermək istədikdə nə etmək lazımdır?
A) Yerindən dillənmək
B) Ayağa qalxmaq
C) Əl qaldırmaq

**4.** Tənəffüsdə aşağıdakılardan hansını etmək **olmaz**?
A) Su içmək
B) Yoldaşlarla söhbət etmək
C) Fit çalmaq

**5.** Yoldaşınız bilmədiyini soruşduqda nə etmək lazımdır?
A) "Get özün öyrən!" demək
B) İzah etmək
C) "Müəllimdən soruş!" demək



## 2-ci dərs *Yolda təhlükəsizlik qaydaları.*

### İNTERAKTİV SUALLAR



**1.** Hansı nəqliyyat vasitələrini tanıyırsınız?
**2.** Niyə şəhərin küçələrində səhər və axşam daha çox avtomobil olur?
**3.** Sizcə, yol hərəkəti qaydalarına riayət olunmasa nələr baş verər?





**A** Yollarda çoxlu nəqliyyat vasitələri hərəkət edir. Qəza baş verməməsi üçün sürücülər **yol hərəkəti qaydalarına** əməl edirlər.

Bizim də əməl etməli olduğumuz qaydalar var. Məktəbə və digər yerlərə gedib-gələrkən səki ilə hərəkət etməliyik. Yolu **piyada keçidlərindən** keçməliyik. Keçid olmayan yerlərdən keçərkən əvvəlcə sola, sonra sağa baxmalıyıq. Əgər avtomobil gəlmirsə, yolu cəld keçməliyik.

Avtobusa minərkən və avtobusdan duşərkən onun tam dayanmasını gözləməliyik. Avtomobildə gedərkən qolumuzu, başımızı pəncərədən çıxarmamalıyıq. Maşınların arxasından sallanmamalıyıq. Avtomobil yolunda oynamamalıyıq.

**B** Hərəkəti nizamlamaq üçün yolların kənarlarına müxtəlif yol nişanları qoyulur. Onların bəziləri sürücülər, bəziləri isə piyadalar üçündür. Həmin nişanların tələblərinə ciddi riayət olunmalıdır. Əks halda qəza baş verə bilər.

Yol hərəkəti qaydalarına əməl olunmasına **yol polisləri** nəzarət edir. Onlar qaydaları pozan sürücüləri və piyadaları cərimələyirlər.






Piyada keçidi


Yerüstü keçid


Yeraltı keçid


Avtobus dayanacağı


Piyada keçə bilər


Piyadanın keçməsi qadağandır!


Piyadaların hərəkəti qadağandır!


Velosipedlə hərəkət qadağandır!

### YOXLAMA SUALLARI



1. Nəyə görə kiçikyaşlı uşaqların avtomobilin qabaq oturacağında əyləşməsinə icazə verilmir?
2. Yol hərəkəti nişanları nəyə lazımdır?
3. Küçəni keçid olmayan yerdən keçərkən necə hərəkət etməlisiniz?



## ÇALIŞMALAR



Doğru cavabı qeyd edin.

**1.** Aşağıdakılardan hansı svetoforun işığı **deyil**?

A) Qırmızı işıq
B) Mavi işıq
C) Yaşıl işıq

**2.** Aşağıdakılardan hansı piyada yoludur?

A) Dəmiryolu
B) Şose
C) Səki

**3.** Aşağıdakılardan hansı nəqliyyat vasitəsi **deyil**?

A) Qayıq
B) Araba
C) Yelləncək

**4.** Adamların avtobusa mindiyi və avtobusdan düşdüyü yer necə adlanır?

A) Dayanacaq
B) Liman
C) Stansiya

**5.** Qolunuzu hərəkət edən avtobusun pəncərəsindən bayıra çıxarsanız nə baş verər?

A) Arı sancar
B) Quş dimdikləyər
C) Qolumuz xəsarət ala bilər

# 3-cü dərs

# *Məktəb demokratiyası. Sinifdə seçki.*

**İNTERAKTİV SUALLAR**



1. Sinif nümayəndəsinin vəzifələri hansılardır?
2. Sinif nümayəndəsi və onun köməkçiləri hansı keyfiyyətlərinə görə seçilir?
3. Sizcə, sinif nümayəndəsinin direktor tərəfindən təyin edilməsi doğrudur, yoxsa seçki yolu ilə seçilməsi? Niyə?



**A** Məktəbin direktor və onun köməkçiləri tərəfindən idarə olunduğunu bilirik. Burada müəllimlərlə yanaşı, kitabxanaçı, bufetçi, gözətçi və xidmətçilər də çalışır. Bir sözlə, hərənin öz vəzifəsi var.

Məktəbdə şagirdlərin də yerinə yetirdikləri vəzifələr var: sinif nümayəndəsi, onun təmizlik və idman işləri üzrə köməkçiləri və s. Şagirdlər həmin vəzifələrə seçilmək üçün əvvəlcə **namizəd** olurlar. Sonra **gizli səsvermə** keçirilir. Hər kəs tərəfdarı olduğu namizədə səs verir. Ən çox səs qazanan həmin vəzifəyə seçilir. Biz seçilən yoldaşımızı təbrik edirik. O isə bizə təşəkkürünü bildirir. Beləliklə, sinifdə **demokratik mühit** yaranır.



**B** Keçən il olduğu kimi, bu il də özümüzə demokratik qayda ilə sinif nümayəndəsi seçdik. Bu dəfə üç namizəd arasında ən çox səs toplayan Toğrul oldu. Müəllimimiz onu sinif nümayəndəsi elan edib, əlini yuxarı qaldırdı. Toğrul hamıya təşəkkür etdi. O, sinfimizin məktəbdə nümunəvi olması üçün çalışacağını bildirdi.

Sonra bu qayda ilə Laləni sinif nümayəndəsinin təmizlik üzrə, Orxanı isə idman üzrə köməkçisi seçdik. Lalə sinfin təmizliyinə və növbətçilərin işinə nəzarət edəcək. Orxan isə başqa siniflərlə idman yarışlarını təşkil edəcək, komandamızın kapitanı olacaq.





**!** ***Yadda saxlayın*** Vəzifəyə seçdiyiniz yoldaşınızın tapşırıqlarını yerinə yetirmək demokratiyanın başlıca tələbidir.

## 4-cü dərs *Təmizkarlıq və sağlamlıq.*

### İNTERAKTİV SUALLAR



1. «Təmizkarlıq» dedikdə nə başa düşürsünüz?
2. Pintilikdən nələr törəyə bilər?
3. «Sağlam adam» dedikdə nə başa düşürsünüz?





**A**

Sağlam olmaq istəyən hər kəs təmizkar olmalıdır. Axı, bir çox xəstəliklər pintilikdən yaranır. Biz daim hərəkətdə oluruq: iş görürük, oynayırıq, idman edirik və s. Nəticədə üst-başımız çirklənir, tərləyirik. Ona görə də əllərimizi tez-tez sabunla yumağa və vaxtaşırı yuyunmağa vərdiş etməliyik. Təmiz və səliqəli geyinməyə öyrəşməliyik. Səhər və axşam dişlərimizi fırçalamalıyıq. Dırnaqlarımızı vaxtlı-vaxtında tutmalıyıq. Üz-gözümüzün, qulaqlarımızın və digər bədən üzvlərimizin təmizliyinə fikir verməliyik. Bununla biz özümüzü, ailə üzvlərimizi və sinif yoldaşlarımızı xəstəliktörədən mikroblardan qorumuş olarıq.



**B**

Yalnız bədənimizi və paltarımızı təmiz saxlamaqla iş bitmir. Ətrafımız da təmiz olmalıdır. Evimizin təmiz və səliqəli olmasına diqqət etməliyik. Yataq otağımızın havasını tez-tez dəyişməliyik.

Məktəbimizin təmizliyinə fikir verməliyik. Axı, məktəb bizim ikinci evimizdir. Biz günümüzün xeyli hissəsini burada keçiririk. Sinifdə təmizliyə riayət etməli və oradakı əşyaları qorumalıyıq. Unutmamalıyıq ki, onlardan başqaları da istifadə edəcək.

Hər kəs öz evini, iş yerini, həyət-bacasını təmiz saxlasa, kəndlərimiz və şəhərlərimiz də təmiz olar. **Vətənimizi — doğma Azərbaycanımızı seviriksə, onun hər bir guşəsinin təmizliyinin qayğısına qalmalıyıq!** Belə olarsa, yurdumuza gələn qonaqlar da bizdən razı qalar.





### YOXLAMA SUALLARI

1. Nəyə görə dişləri yeməkdən sonra yumaq lazımdır?
2. Dırnaqları vaxtlı-vaxtında tutmasaq nə baş verər?
3. Nəyə görə tez-tez yuyunmaq lazımdır?
4. Kənd və şəhərlərimizin təmiz olması üçün nə etmək lazımdır?



## ÇALIŞMALAR



Doğru cavabı qeyd edin.

**1.** Sinif nümayəndəsinin köməkçilərini kim seçməlidir?

A) Sinif nümayəndəsi
B) Şagirdlər
C) Müəllim

**2.** Aşağıdakılardan hansı təmizlik üzrə köməkçinin vəzifəsidir?

A) İdman yarışlarının təşkili
B) Sinifdə səliqə-sahmana nəzarət etmək
C) Müəllim olmayanda sinifdə sakitliyi təmin etmək

**3.** Təmizkarlıq nə üçün lazımdır?

A) Yaxşı görünmək üçün
B) Sağlam olmaq üçün
C) Yaxşı qiymət almaq üçün

**4. «... pulla almaq olmaz.»** cümləsində nöqtələrin yerinə aşağıdakılardan hansını yazmaq olar?

A) Ləzzətli yeməyi
B) Sağlamlığı
C) Qəşəng paltarı

**5.** Meyvəni yeməzdən əvvəl nə etmək lazımdır?

A) Paltara sürtmək
B) Cib dəsmalı ilə silmək
C) Su ilə yumaq



5-ci dərs

# *Diqqətli olaq. Qəzalardan qorunaq.*

### İNTERAKTİV SUALLAR



1. «Diqqətli olmaq» ifadəsini necə başa düşürsünüz?
2. «Diqqətli ol!» sözlərini ən çox harada eşidirsiniz?
3. Diqqətli olmayanda nələr baş verə bilər?






**A** Evdə, məktəbdə, həyətdə valideynlərdən, müəllimlərdən və böyüklərdən tez-tez eşidirik: «Diqqətli ol!», «Diqqətlə qulaq as!», «Diqqətlə bax!». Bəs, diqqətli olmaq nə deməkdir? Diqqətli olmaq — gözünlə gördüyün, qulağınla eşitdiyin hər şeyə fikir verməkdir. Diqqətli adam heç nəyi gözdən qaçırmır.

Biz həmişə diqqətli olmalıyıq: kitab oxuyarkən, iş görərkən, yemək yeyərkən, söhbət edərkən, yolu keçərkən. Məktəbdə dərs zamanı müəllimi diqqətlə dinləməli, onun göstərişlərini yerinə yetirməliyik.

Hər gün hər yerdə diqqətli olmağa vərdiş etməliyik. Çünki diqqətsiz adam həmişə çətinliklərlə üzləşər.

**B** Davranış qaydalarına riayət etməmək, diqqətsizlik və ehtiyatsızlıq bəzən xoşagəlməz hadisələrlə nəticələnir. Ona görə də iş görərkən ehtiyatlı olmalı, qəza törədə biləcək hərəkətlər etməməliyik. Dəlici, kəsici və yandırıcı əşyalarla oynamamalıyıq. Yanımızda böyüklər olmadıqda elektrik cihazlarından istifadə etməməliyik.

Təsadüfən qəza baş veribsə, yenə müəyyən qaydalara əməl etməliyik. Xəsarət alanlara diqqətlə, tələsşız və hay-küysüz ilkin yardım göstərməliyik. İlkin yardımı yalnız onu bacaranlar edə bilərlər. Xəsarət ciddidirsə, yubanmadan böyüklərə və həkimlərə xəbər verməliyik.








**C** **1.** Əgər əlinizdə və ya ayağınızda yanıq varsa:

— *yumurtanın ağını yanmış yerə çəkin;*

— *kartofu kəsib yanmış yerə qoyun.*

**2.** Əgər burnunuzdan qan açılıbsa:

— *burnunuzun üstünə soyuq suda isladılmış dəsmal qoyun;*

— *qan burunun sağ deşiyindən gəlirsə sol əlinizi, sol deşiyindən gəlirsə sağ əlinizi yuxarı qaldırın.*

**3.** Əgər barmağınız, qolunuz, ayağınız yaralanıbsa, *yaranı təmiz sarğı ilə sarıyın.*

**4.** Əgər ayağınızda, əlinizdə sınıq və ya çıxıq olarsa, *yerinizdən tərpənməyin, böyükləri və həkimi gözləyin.*







**YOXLAMA SUALLARI**



1. Səhər məktəbə hazırlaşarkən diqqətli olmasanız nə baş verə bilər?
2. Meşədə qolunuz sıyrılarsa, hansı ilkin tibbi tədbirləri görməlisiniz?
3. Xoşagəlməz hadisələr hansı səbəblərdən baş verir?

# ÇALIŞMALAR



Şəklə diqqətlə baxın. Kimin evdə gizləndiyini müəyyən edin.


Anar


Lalə


Elçin


Nərgiz


Eldar





6-cı dərs

# Dost kimdir?

**İNTERAKTİV SUALLAR**



1. «Dost» dedikdə nə başa düşürsünüz?
2. Dostunuzla aranızda narazılıq yarananda nə edirsiniz?
3. Necə fikirləşirsiniz, dostunuz başqaları ilə də dostluq edə bilərmi?



**A**

*Müəllim*: Siz dostsunuz, niyə bir-birinizə arxa çevirmisiniz?
*Samir*: Sabir məndən küsüb.
*Sabir*: Xeyr, Samir məndən küsüb.
*Müəllim*: Nəyə görə?
*Samir*: Mən ondan məktəbə nə üçün ütüsüz şalvarla gəldiyini soruşdum.
*Sabir*: Xeyr, əvvəlcə mən ona əllərinin çirkli olduğunu bildirmişdim.
*Müəllim*: Məgər dost dostun nöqsanını deməməlidir?
*Samir*: Deməlidir.
*Sabir*: Əlbəttə, deməlidir.
*Müəllim*: Bəs, onda niyə küsürsünüz? Barışın.
*Samir*: Sabir, məni bağışla! Üzr istəyirəm.
*Sabir*: Samir, sən də məni bağışla! Bir də belə səhvə yol verməməliyik.

**B** «Yaxşı dost qardaş kimidir». Bunu atalarımız deyib. Bəlkə də elə ona görə insanlar həmişə özlərinə dost axtarıblar. Dostlar şən gündə də, çətin gündə də gərək bir yerdə olsun, bir-birinin sevincinə, kədərinə şərik olsunlar. Dostlar arasında inam və etibar olmalıdır. Dost dostun səhvini üzünə deməlidir. Onlar lazım gəldikdə bir-birinə təmənnasız kömək etməlidirlər.

Dostluq yalnız ayrı-ayrı insanlar arasında yox, ailələr, xalqlar, ölkələr arasında da olur.


Ad günün mübarək!


Keçmiş olsun!

**YOXLAMA SUALLARI**

1. Nə vaxtsa dostundan kömək istəmisənmi? O sənə kömək edibmi?
2. Bəs, özün nə vaxtsa dostuna kömək etmisənmi?
3. «Dost dar gündə tanınar», «Dost dosta tən gərək!» atalar sözlərinin mənasını necə başa düşürsünüz?





II bölüm





# HƏYAT ÜÇÜN NƏLƏR LAZIMDIR?





7-ci dərs

# Fəsillər necə dəyişir?

## İNTERAKTİV SUALLAR



1. Şəkillərdə ilin hansı fəsilləri əks olunub? Bunu necə müəyyən etdiniz?
2. Fəsilləri daha hansı əlamətlərinə görə müəyyən etmək olar?
3. Skamyanın heç bir fəsildə dəyişməməsinin səbəbi nədir?



**A** İsti yay günləri arxada qalıb. Artıq payızdır. Köçəri quşlar uçub isti yerlərə gedib. Gündüzlər qısalmağa, gecələr uzanmağa başlayıb. Sular da soyuyub. Daha dənizdə, çayda çimmək olmur. Ağacların yarpaqları saralıb tökülür, xəzəl olur.

Alimlər öyrəniblər ki, ağacların yarpaqlarına yaşıl rəng verən **xlorofil** adlı maddədir. Yazda, yayda bol günəş şüalarının təsiri ilə yarpaqlarda xlorofil əmələ gəlir. Onlar yamyaşıl olurlar. Payızda isə günəşin şüaları və istiliyi azalır. Ona görə də bir çox ağacların yarpaqlarında xlorofil əmələ gəlmir. Yarpaqlar saralıb tökülür.

Qarşıdan qarlı-şaxtalı qış fəsli gəlir.



**B** Maraqlıdır, görəsən, fəsillər necə dəyişir?

Yer kürəsinin Günəşin ətrafına bir ilə fırlandığını bilirik. Bu müddətdə Yer özünün ayrı-ayrı tərəflərini Günəşə çevirir. Günəşə tərəf duran tərəflər çox, digər tərəflər isə az işıq və istilik alır. İşığın və istiliyin az və ya çox olması nəticəsində fəsillər dəyişir. Yerin Vətənimiz Azərbaycan yerləşən tərəfində dörd fəsil olur: yaz, yay, payız, qış. Dünyanın elə yerləri var ki, orada bircə fəsil olur. Ekvatorda həmişə yay, şimal və cənub qütblərində isə həmişə qışdır.




## YOXLAMA SUALLARI



1. Yer Günəş ətrafına bir dəfə fırlanınca nə qədər vaxt keçir?
2. Fəsillərin dəyişməsinin səbəbi nədir?
3. Payızda yarpaqların saralıb tökülməsinin səbəbi nədir?
4. Yer kürəsinin hansı hissəsində həmişə yay, hansı hissəsində həmişə qış olur?



*Yadda saxlayın*

**Yaz ayları:** mart, aprel, may.
**Yay ayları:** iyun, iyul, avqust.
**Payız ayları:** sentyabr, oktyabr, noyabr.
**Qış ayları:** dekabr, yanvar, fevral.

# ÇALIŞMALAR



Hekayəni ən çox uyğun gələn atalar sözü ilə bitirin.

**1. Əkəndə yox, biçəndə yox, yeyəndə ortaq qardaş.**
**2. İşləməyən dişləməz.**
**3. İstəyənin bir üzü qara, verməyənin iki üzü.**









Orxanla Aytən ilboyu bağdakı ağaclara qulluq elədilər. Qışda onların dibinə qar yığdılar. Yazda ətraflarını xəzəldən təmizləyib yumşaltdılar. İsti yay günlərində suladılar. Kaloğlan onlara kömək eləmədi. Gününü velosiped sürməklə, itpişiklə oynamaqla, mayallaq aşmaqla keçirdi. Payız gəldi. Meyvələr yetişdi. Orxanla Aytən zəhmətlərinin bəhrəsindən dərib yemək istədilər. Hardansa Kaloğlan da peyda oldu. Boynunu büküb onlardan meyvə istədi. Orxanla Aytən ona dedilər:

— ..............................................................................





# *Hava necə olacaq?*

## İNTERAKTİV SUALLAR



1. Bu gün hava necədir?
2. Dünənki hava ilə bugünkü hava arasında hansı fərqləri müşahidə edirsiniz?
3. Hava haqqında məlumat insanların nəyinə lazımdır?



Buludlu hava



Şaxtalı hava



Dumanlı hava



Qarlı hava

**A** Bu gün hava necə olacaq? Bəs, sabah? Bu sual insanları həmişə düşündürüb. Axı, onlar məhsul becərmək, ev tikmək, səyahətə çıxmaq üçün öz işlərini əvvəlcədən planlaşdırırlar. Təbiətdə isə hava daim dəyişir. Bəzən nəinki bir gün, hətta bir saat ərzində gah isti, gah soyuq, gah küləkli, gah da yağmurlu olur. Hələ qədim zamanlardan insanlar havanın necə olacağını əvvəlcədən bilmək üçün bitkilər və heyvanlar üzərində müşahidələr aparıblar. Öyrəniblər ki, qaranquşlar alçaqdan uçursa, yağış yağacaq. Gecəyarı cırcıramalar oxuyursa, sabah gün aydın və isti keçəcək. Pişik döşəməni cırmaqlayırsa, külək əsəcək. Zəmidə buğdanın saplaqları gödəkdirsə, qış qarlı keçəcək.


Yerüstü stansiya


Hava termometrləri


Kosmik stansiya

**B** Hava haqqında məlumatı öyrənən xüsusi stansiyalar var. Onlar Yer kürəsinin müxtəlif məntəqələrində qurulub. Hava haqqında məlumatı öyrənmək üçün kosmik peyklərdən də istifadə olunur. Peyklər Yerin ətrafına fırlanaraq, yerdə baş verən hava dəyişikliklərini kosmosdan müşahidə edir və stansiyalara xəbər verirlər. Hava haqqında məlumatları öyrənən insanlar **sinoptiklər** adlanır.

Hava haqqında məlumatları indi radiodan, televizordan, internetdən almaq olar. Bu işdə hətta cib telefonları da köməyimizə gələ bilər.

Havanın temperaturunu özümüz də ölçə bilərik. Bunun üçün **termometr** adlanan cihazdan istifadə olunur.



Stolüstü termometr




Küçə termometri



# ÇALIŞMALAR



Həftə ərzində hər gün günorta havanın necə olduğunu müşahidə cədvəlində "+", "–" işarələrinin köməyilə qeyd edin.

| Hava → / Günlər ↓ | Günəş | Külək | Günəş, bulud | Şimşək | Yağış | Göy qurşağı | Qar |
|---|---|---|---|---|---|---|---|
| **1. Bazar ertəsi** | | | | | | | |
| **2. Çərşənbə axşamı** | | | | | | | |
| **3. Çərşənbə** | | | | | | | |
| **4. Cümə axşamı** | | | | | | | |
| **5. Cümə** | | | | | | | |
| **6. Şənbə** | | | | | | | |
| **7. Bazar** | | | | | | | |

**9-cu dərs** *Hava.*

**İNTERAKTİV SUALLAR**



1. Havanın varlığını necə hiss etmək olar?
2. Onun rəngi, iyi və forması haqqında nə deyə bilərsiniz?
3. Havanın insan həyatı üçün əhəmiyyətini necə izah edə bilərsiniz?




**A** İnsan bir müddət susuz və qidasız yaşaya bilər. Havasız yaşamaq isə mümkün deyil. Nəfəsinizi içəri çəkib fikrinizdə sayın: bir, iki, üç, ... . On beşə çatmamış nəfəs almaq istəyəcəksiniz.

Yer üzündə bütün canlılar havaya möhtacdır. Ona görə də deyirlər ki, hava həyat mənbəyidir.

Hava həm də Yer kürəsini Günəşin yandırıcı istisindən, Kosmosun soyuğundan qoruyur. Əgər hava qatı olmasaydı, Yer üzü gündüzlər qaynar qazana, gecələr isə buzxanaya dönərdi. Ətrafımızdakı meşələr, çəmənliklər, barlı-bəhrəli çöllər cansız səhralara çevrilərdi. Başqa planetlərdə və Ayda olduğu kimi, Yerdə də həyat olmazdı.



**B** Ətrafımızda hər yerdə hava var. Rəngi olmadığına görə biz onu görə bilmirik. Havanın iyi və dadı da yoxdur. Hava bütün boşluqları, hətta qab-qacaqların, əşyaların içindəki boşluqları da doldurur.

İnsanlar havadan bir çox işlərdə istifadə edirlər. Uşaq şarları, toplar, avtomobilin və velosipedin təkərləri hava ilə doldurulur. Balıqçılar bəzən hava doldurulmuş qayıqlardan istifadə edirlər. Dənizçilər suda batmamaq üçün özləri ilə hava kəmərləri götürürlər. Su altında işləyənlər hava balonları ilə nəfəs alırlar.

Havadan qaynaq işlərində də istifadə olunur, çünki hava yanmaya kömək edir.



**YOXLAMA SUALLARI**

1. Dərindən nəfəs aldıqda köksümüz niyə qabarır?
2. Ocaq pis yananda nəyə görə üfürürlər?
3. Yaşadığınız yerdə havanı nələr çirkləndirir?
4. Sizcə havanın təmizliyini qorumaq üçün nə etmək lazımdır?



# ÇALIŞMALAR



Valideynlərinizin köməyi ilə araşdırma aparın və suallara cavab verin.



**1.** İki stəkan su götürün. Birinə daş parçası, digərinə isə qənd parçası atın. Daş parçası atılan stəkandan fərqli olaraq, qənd parçası atılan stəkandan qovuqcuqlar çıxacaq. **Niyə?**

**2.** Yarısına qədər su ilə doldurulmuş ləyən və boş stəkan götürün. Stəkanı əvvəlcə birinci şəkildəki kimi suya üzüaşağı salın. Bu zaman maneə hiss edəcəksiniz. Sonra stəkanı ikinci şəkildəki kimi yana əyib suya salın. Bu zaman stəkan asanlıqla suya batacaq. **Bunun səbəbi nədir?**







**3.** İki şam yandırın. Birinin üstünü şəkildəki kimi boş banka ilə qapayın. Az keçmiş banka ilə qapanmış şam sönəcək. O biri şam isə yanmağına davam edəcək. **Nəyə görə?**





*10-cu dərs* *Su.*

## İNTERAKTİV SUALLAR



1. Suyun canlılar üçün əhəmiyyəti nədir?
2. Qar və buzun əmələ gəlməsi barədə nə bilirsiniz?
3. Suyun rəngi barədə nə deyə bilərsiniz? "Şəffaf" sözünü necə başa düşürsünüz?



**A** Susuz həyat ola bilməz. Yer üzündə yaşayan bütün canlılara su lazımdır. Bir çox canlılar suda yaşayır. Su və tərkibində su olan qidalar olmasa, insan bir həftədən artıq yaşaya bilməz. Axı, bədənimizin çox hissəsini su təşkil edir. Su yalnız içmək üçün deyil, həm də yemək hazırlamaq, təmizlik işləri görmək, bağ-bağçalarımızı suvarmaq, heyvanlarımızı sulamaq üçün lazımdır.

Su nəqliyyatı ən ucuz nəqliyyat növüdür. Okeanlarda, dənizlərdə, böyük çaylarda üzən gəmilər insanları və yükləri bir yerdən başqa yerə daşıyır.

Axar sulardan həm də elektrik enerjisi almaq olur.

**B** Bəzən danışıq zamanı suyun ağ rəngdə olduğunu deyirlər. Bu, yanlış fikirdir. Bunu sübut etmək üçün bir stəkan süd və bir stəkan təmiz su götürək. Hər ikisinin içərisinə qənd parçası ataq. Süd ağ olduğuna görə onun içərisindəki qənd görünməyəcək. Su rəngsiz, daha doğrusu, **şəffaf** olduğu üçün onun içərisindəki qənd aydın görünəcək.

Təmiz suyun dadı və qoxusu olmur. Onun forması da yoxdur. Hansı qaba töksək həmin qabın formasını alır.

Su axa bilir, buxarlanır və donur. Yəni bir haldan başqa hala keçir. Onun bu xassələri yağış və qar yağmasına, çayların əmələ gəlməsinə səbəb olur. Su həm də bəzi maddələri, məsələn, havanı, qəndi və duzu özündə həll edir.



Su axır



Su buxarlanır



Su həll edir



Su donur

**YOXLAMA SUALLARI**



1. Suyun şəffaf olduğunu daha necə sübut edə bilərsiniz?
2. Suyun hansı xassələri var?
3. Suyun hansı xassəsi çayların əmələ gəlməsinə səbəb olur?



## ÇALIŞMALAR



Şəkillərə ardıcıllıqla baxın və **«Su damlasının səyahəti»** nağılını davam etdirin.



*Biri vardı, biri yoxdu. Dənizdə bir su damlası vardı. Bir gün o, başqa damlalarla birlikdə buxarlanıb havaya qalxdı.*

## *11-ci dərs* *Torpaq.*

**İNTERAKTİV SUALLAR**



1. Yaşadığımız ərazidə hansı rəngdə torpaqlar var?
2. Bizim torpaqlarda hansı bitkilər daha yaxşı bitir?
3. Torpağın insanlar və bitkilər üçün əhəmiyyəti nədir?



**A**

— Orxan, sən atanla meşəyə getməmişdin? Yoxsa odunları kisəyə doldurmusunuz?

— Yox, bu dəfə torpaq gətiririk.

— Torpağı neyləyirsiniz, həyət-bacanız torpaq deyil?

— Onu təzə basdıracağımız tinglərin dibinə tökəcəyik. Meşə torpağı bitkiləri daha yaxşı inkişaf etdirir.

— Nəyə görə?

— Meşə torpağı daha qüvvətlidir, çünki ağacların xəzəli çürüyüb onu daha da münbit edir. Hələ bunun rənginə bax! Şabalıd rəngindədir.

— Doğrudan da tünddür, amma bizim həyətin torpağı bombozdur. Yəqin ona görə tinglərimiz yaxşı inkişaf etmir.

— Əlbəttə.

— Gələn dəfə torpaq gətirməyə gedəndə mənə də de.

— Deyərəm, Tural, mütləq deyərəm. Bərabər gedərik.



**B**

Həyat üçün torpaq da hava və su kimi vacibdir. Biz qidalarımızın və geyimlərimizin çoxunu torpağın məhsulu olan bitkilərdən alırıq.

Torpaq yerin bitki bitən üst qatıdır. Torpağın tərkibində qum, toz, gil, su, hava, həmçinin bitki və heyvan çürüntüləri var. Bunlar bitkilərin qidalanması və inkişafı üçün lazımdır. Bir çox canlılar, məsələn, soxulcanlar və bəzi cücülər torpaqda yaşayır.

Torpaq qara, boz, sarı, şabalıdı və başqa rənglərdə olur. Onun başlıca xüsusiyyəti isə münbitliyidir. Münbitliyi çox olan torpaqda bitki daha yaxşı inkişaf edir və bol məhsul verir. Torpağın münbitliyini artırmaq üçün ona peyin və gübrə qatırlar.

Ölkəmizdə torpaqların böyük bir hissəsi münbitdir. Bu torpaqlarda hər şey bitir.

Vətənimizin cürbəcür sərvətləri var. Ən böyük sərvətimiz isə bərəkətli torpaqlarımızdır.



**YOXLAMA SUALLARI**

1. Bitkinin torpaqla nə kimi əlaqəsi var?
2. Ətlə qidalanan heyvanlar üçün torpağın faydası nədir?
3. Torpaqda yaşayan hansı canlıları tanıyırsınız?
4. Torpağı münbitləşdirmək üçün nə etmək lazımdır?



# ÇALIŞMALAR



Doğru cavabı qeyd edin.

**1.** Torpaq yerin hansı qatıdır?

A) Alt
B) Orta
C) Üst

**2.** Bu rənglərdən hansı torpağın rəngi **deyil**?

A) Sarı
B) Yaşıl
C) Boz

**3.** Aşağıdakılardan hansı torpağın tərkibində **yoxdur**?

A) Qum
B) Su
C) Sement

**4.** Nəyə görə meşə torpağı daha quvvətli olur?

A) Yumşaq olduğuna görə
B) Tərkibində çoxlu çürüntü olduğuna görə
C) Həmişə kölgədə olduğuna görə

**5.** Qızılgül kolunun dibinə aşağıdakılardan hansını tökmək olar?

A) Sabunlu su
B) Duzlu su
C) Arx suyu





## İNTERAKTİV SUALLAR



1. Yer üzündə həmişə gecə olsa nələr baş verər?
2. Günəşin canlılara faydası haqqında nə bilirsiniz?
3. İlin hansı fəslində Günəşə «işığı var, istisi yox» deyirlər? Nəyə görə?



**A**

— Ata, bu nə idi, başımızın üstündən uçub keçdi?
— Yarasadır, oğlum, ova çıxıb. Uça-uça cücüləri tutur.
— Qaranlıqda ov olar? Gündüzlər ona bəs eləmir?
— Yox, bala, yarasalar gündüzlər ağacların koğuşunda, evlərin çardağında, divarlardakı daşların arasında gizlənirlər. Onlar işıqdan qorxurlar.
— Ata, bəs, deyirdin bütün canlılara işıq lazımdır? Yarasaya işıq lazım deyilmiş ki?!
— Yox, oğlum, doğrudan da bütün canlılara işıq lazımdır. İşıq olmasa, bitkilər olmaz. Bitkilər olmasa, cücülər ac qalıb məhv olar. Cücülər də olmasa, yarasalar qidasız qalarlar. Bax, görürsən, yarasaya da işıq lazımdır.
— Hə, bunu heç fikirləşməmişdim...



**B** Hava, su və torpaq lazımınca isinməsə, Yer üzündə həyat olmaz. Deməli, canlıların yaşaması üçün Günəşin işığı və istiliyi də çox vacibdir.

Yer üzündə külək, yağış, qar da Günəşin təsiri ilə əmələ gəlir.

Günəşdən başqa Yerə ulduzlar da işıq salır. Bunu aydın gecələrdə müşahidə etmək daha asandır. Lakin ulduzlar çox uzaqlarda yerləşdiyindən, onların Yerə düşən işıqları zəif olur.

Hələ keçmiş zamanlardan insanlar qaranlıqda istifadə etmək üçün müxtəlif çıraqlar, soyuq havalarda evləri qızdırmaq üçün isə sobalar icad etmişlər. Hazırda istifadə olunan qaz, daş kömür, odun, elektrik sobaları, elektrik lampaları da insanların bu tələbatlarını ödəyir. Elektrik işığından və sobalardan istifadə etməklə soyuq qış aylarında istixanalarda tərəvəz məhsulları, müxtəlif meyvələr də yetişdirilir.

**YOXLAMA SUALLARI**

1. Nəyə görə Ay işıq mənbəyi hesab olunmur?
2. Yaşadığınız ərazidə evləri hansı vasitələrlə qızdırırlar?
3. İstixanalarda işıq və istilikdən nə məqsədlə istifadə olunur?





# ÇALIŞMALAR



Doğru cavabı qeyd edin.

**1.** Planetimizdə canlıların yaşamasını və inkişafını təmin edən hansı işıqdır?

A) Ay işığı
B) Günəş işığı
C) Ulduz işığı

**2.** Bitkilərin yarpağına yaşıllıq verən aşağıdakılardan hansıdır?

A) Yağış
B) Külək
C) Xlorofil

**3.** Yer kürəsinin hansı hissəsində həmişə yay olur?

A) Azərbaycanda
B) Antarktidada
C) Ekvatorda

**4.** Nəyə görə köçəri quşlar payızda isti yerlərə uçub gedirlər?

A) Yarpaqlar töküldüyünə görə
B) Soyuqlar düşdüyünə görə
C) Qida azaldığına görə

**5.** Aşağıdakı heyvanlardan hansı isti ölkələrdə **yaşamır**?

A) Zürafə
B) Ağ ayı
C) Fil

## 13-cü dərs

# *Qidalar. Süfrə arxasında davranış qaydaları.*

**İNTERAKTİV SUALLAR**



1. Hansı qida məhsullarını tanıyırsınız?
2. Tez-tez eşitdiyiniz «düzgün qidalanma» sözlərinin mənasını necə başa düşürsünüz?
3. «Süfrə arxasında davranış qaydaları» dedikdə nəyi başa düşürsünüz?







**A** Bütün canlılar kimi insanların da qidaya ehtiyacı var. İnsan havasız, susuz, işıqsız, istiliksiz yaşaya bilmədiyi kimi, qidasız da yaşaya bilməz. Süfrələrimizdə müxtəlif yeməklər olur. Onları hazırlayarkən analarımız cürbəcür qida məhsullarından istifadə edirlər. Bu qida məhsullarının bir hissəsi bitkilərdən (*şəkil 1*), bir hissəsi heyvanlardan (*şəkil 2*) alınır. Bəzi qida məhsulları isə mədənlərdən (*şəkil 3*) çıxarılır.



**A** Düzgün, keyfiyyətli, vaxtlı-vaxtında qidalanma bizi müxtəlif xəstəliklərdən qoruyur və inkişaf etdirir. Qida sağlamlığımızı möhkəmləndirir, iş qabiliyyətimizi artırır. Yaxşı qidalananda dərslərimizi də yaxşı qavrayırıq.

Sağlam inkişaf etmək üçün qida məhsullarının hamısından ancaq lazımi miqdarda yeməliyik. Gündə üç dəfə — səhər, günorta və axşam yeməyə öyrəşməliyik. Süfrə arxasında aşağıdakı qaydalara riayət etməliyik:

— *düzgün və rahat əyləşmək;*
— *çox isti və çox soyuq yeməmək;*
— *ağızda yemək olarkən danışmamaq;*
— *yeməyi səssiz və yaxşı çeynəmək;*
— *qaşıq, çəngəl və bıçaqdan istifadə etməyə alışmaq;*
— *yeməkdən sonra süfrəni hazırlayanlara təşəkkür etmək;*
— *süfrəni yığışdırmağa kömək etmək.*



**YOXLAMA SUALLARI**



1. Sizcə, bal hansı qida məhsullarındandır?
2. Hansı bitkilərin toxumlarından qida məhsulu kimi istifadə olunur?
3. Hansı qida məhsullarını çiy (bişməmiş) yemək **olmaz**?

# ÇALIŞMALAR



Ananız yarpaq dolması bişirərkən hansı qida məhsullarından istifadə edir? Cavablarınızı aşağıdakı siyahılara yazın.





| Bitkilərdən alınan qida məhsulları: | Heyvanlardan alınan qida məhsulları: |
|---|---|
| 1.________ | 1.________ |
| 2.________ | 2.________ |
| 3.________ | 3.________ |
| 4.________ | 4.________ |
| 5.________ | 5.________ |
| 6.________ | 6.________ |

Mədənlərdən çıxarılan qida məhsulları:

1.________

2.________

3.________



III bölüm





# CANLILAR ALƏMİ





## 14-cü dərs | *Yabanı və mədəni bitkilər.*

**İNTERAKTİV SUALLAR**



1. Aşağıdakı şəkillərdə hansı bitkiləri görürsünüz?
2. Həmin bitkilərdən hansılar insan əməyinin məhsuludur?
3. «Yabanı bitki» və «mədəni bitki» dedikdə nə başa düşürsünüz?









**A** Çöldə, çəmənlikdə, meşədə gəzərkən cürbəcür otlar, çiçəklər, ağaclarla rastlaşırıq. Onların gözəlliyinə tamaşa edir, həzz alırıq. Bu bitkiləri heç kəs əkib-becərmir, özləri bitib böyüyür. Ona görə də onlara **yabanı bitkilər** deyirlər.

Yabanı bitkilər yalnız gözəllik və təmiz hava mənbəyi deyil. Onlar həm də insanların, heyvanların, quşların, cücülərin yaşaması üçün lazımdır. Bir çox canlılar yabanı bitkilərin meyvələri, toxumları və yarpaqları ilə qidalanır. Ağacların o ‘uncağından isə tikinti və yanacaq materialı kimi istifadə edirik.

Təbiətdə lazımsız heç nə yoxdur.



**B** İnsanlar qidalanmaq və başqa ehtiyaclarını təmin etmək üçün bir çox bitkiləri özləri əkib-becərirlər. Xüsusi qulluq tələb edən belə bitkilərə **mədəni bitkilər** deyilir.

Mədəni bitkilər müxtəlif məqsədlərlə becərilir. Meyvə və tərəvəzdən qida məhsulu kimi istifadə olunur. Taxıldan çörək və başqa ərzaq məhsulları hazırlanır. Günəbaxan, qarğıdalı və zeytundan yağ alınır. Pambıqdan geyim əşyaları hazırlanır. Bəzi mədəni bitkilərdən isə evlərimizi, həyət-bacalarımızı, küçələrimizi, parklarımızı bəzəmək üçün istifadə edirik. Onlara dekorativ bitkilər də deyilir.









**YOXLAMA SUALLARI**

1. Yabanı və mədəni bitkilərin fərqi nədir?
2. İnsanlar mədəni bitkiləri nəyə görə əkib-becərirlər?
3. «Təbiətdə lazımsız heç nə yoxdur» ifadəsinin mənasını necə başa düşürsünüz?



# ÇALIŞMALAR



Yabanı bitkiləri işarələyin.














## 15-ci dərs Cücülər.

**İNTERAKTİV SUALLAR**



1. Cücülər haqqında nələri bilirsiniz?
2. Şəkildəki cücülərdən hansıları görmüsünüz?
3. Yaşadığınız ərazidə hansı cücülərə daha çox rast gəlirsiniz?


Kəpənək


Arı


Parabizən


Qarışqa


Yaşıl çəyirtkə


Milçək


İynəcə


Dəvədəlləyi


Ağcaqanad


Su hörümçəyi

**A**

Canlılar aləminin böyük bir hissəsini **cücülər** təşkil edir. Kəpənək, arı, milçək, ağcaqanad, cırcırama, may böcəyi, qarışqa — bunlar hamısı cücüdür. Cücülər bir-birindən böyük-kiçikliklərinə, görünüşlərinə, rənglərinə görə fərqlənsə də hamısının altı ayağı olur. Ona görə də cücülərə bəzən «**altıayaqlılar**» da deyirlər. Onlara çöldə, çəmənlikdə, meşədə, bağ-bağçada, dağda, dərədə, bir sözlə, hər yerdə rast gəlirik.

Suda yaşayan cücülər də var.

**B** Cücülərin insanlara və ətraf aləmə böyük faydası var. Arıdan bal, ipəkqurdundan ipək alınır. Parabizən yarpaqlardakı bitləri yeməklə bitkiləri onlardan qoruyur. Quşlar və bəzi heyvanlar cücülərlə qidalanır.

Zərərli cücülər də var. Kartof böcəyi kartofun yarpaqlarını yeməklə onun inkişafına mane olur. Çəyirtkələr çoxalanda nəinki tarlaları, hətta bütün yaşıllıqları məhv edirlər. Ağcaqanad və milçəklər adamları sancır, xəstəlik törədən mikroblar yayırlar.



Cücünün əsas hissələri



**YOXLAMA SUALLARI**

1. Görəsən, cücülər olmasa nə baş verər?
2. Bal arısını və ipəkqurdunu ev heyvanı adlandırmaq olarmı? Niyə?



**!** ***Yadda saxlayın*** Böyük və kiçikliyindən asılı olmayaraq hər bir canlı təbiət üçün lazımdır.



# ÇALIŞMALAR



Cücüləri tapıb rəngləyin.



# 16-cı dərs Quşlar.

**İNTERAKTİV SUALLAR**



1. Hansı quşları tanıyırsınız?
2. Yaşadığınız ərazidə hansı quşlarla rastlaşırsınız?
3. Quşların oxşar və fərqli cəhətləri nədir?




**A** Təbiətin ən maraqlı canlılarından biri də quşlardır. Diqqətlə nəzər yetirsək, onların başqa heyvanlardan xeyli fərqləndiklərini görərik: quşlar ikiayaqlıdır; dimdikləri var; bədənləri lələklərlə örtülüb; uça bilirlər.

Quş lələyi əsil möcüzədir. İçi boş və yüngül olduğundan, lələk quşun uçmasına, havada uzun müddət qalmasına kömək edir. Onu yağışdan, qardan, soyuqdan qoruyur. Ən uzun lələklər quşun qanadlarında və quyruğunda olur.

Quşun başqa bir möcüzəsi də onun dimdiyidir. Dimdik dodaq və burunu əvəz etməklə yanaşı, həm də onun silahıdır. Quş dimdiyi ilə nəyi isə tutur, yeri eşir, yuva qurur, lələklərini təmizləyir, yumurtalarını çevirir. Quş həm də dimdiyi ilə hücum edir və müdafiə olunur.



**B** Bəzi quşların yuvaları əsil evə bənzəyir. Məsələn, sağsağanın yuvasında döşəmə, divar və çardaq görmək olar. Yuvaları budaqdan asılmış nənniyə bənzəyən quşlar da var. Onlar öz yuvalarını çöplərdən, otlardan, xırda budaqlar və palçıqdan hörür, içərisinə tük, lələk, yumşaq ot döşəyirlər. Bu, onların yumurtalarının salamatlığı və körpə balalarının rahatlığı üçün lazımdır.

Quşların qidaları da cürbəcür olur. Bəziləri başqa heyvanların əti ilə, bəziləri cücülərlə, bəziləri isə bitkilərlə, onların meyvələri və toxumları ilə qidalanırlar. Quşlar zərərli cücüləri məhv etməklə insanlara böyük fayda verirlər.

Payızda quşların qidaları azaldığından, onların bir çoxu isti yerlərə uçub gedirlər. Yurdumuzda qışlayan quşların bəziləri özlərinə qış tədarükü görür. Digər quşlar isə meşədə, çöldə və yaşayış məntəqələrində tapdıqları yemlərlə qidalanırlar.



**YOXLAMA SUALLARI**



1. Quşlar başqa heyvanlardan nə ilə fərqlənirlər?
2. Quşlar yuvalarını düzəldərkən nələrdən istifadə edirlər?
3. Quşlar nə ilə qidalanırlar?
4. Nəyə görə bəzi quşlar payızda isti ölkələrə uçub gedirlər?

# ÇALIŞMALAR



Hər quşu uyğun gələn sözlə birləşdirin.





banlayır

qıy vurur



danışır



qaqqıldayır



quruldayır



qarıldayır



cikkildəyir



civildəyir



oxuyur





## İNTERAKTİV SUALLAR



1. Təcili yardım maşınlarında, yanğınsöndürən maşınlarda, svetoforlarda istifadə olunan qırmızı rəng nəyi bildirir?
2. Sizcə, bəzi heyvanların nəslinin kəsilməsinə səbəb nə ola bilər?
3. Sayı azalan heyvanları kim qorumalıdır?







Şəfəqsaçan



Apollon



Qafqaz sarıcası



Xanımotu



Şümşad



Eldar şamı



Şərq çinarı

«Qırmızı kitab»a düşmüş bəzi bitki və cücülər

**A** Təbiətin gözəlliklərindən hamımız zövq alırıq. Güllərə, çiçəklərə, onların üzərində uçuşan kəpənəklərə, quşlara tamaşa etməkdən doymuruq. Quşların şən nəğmələrinə qulaq asdıqca yorğunluğumuz çıxır. Təəssüf ki, insanların səhv hərəkətləri nəticəsində bəzi bitkilərin, heyvanların, quşların, cücülərin sayı azalıb, nəsli kəsilməkdədir. Ona görə də dövlətimiz onları qorumaq üçün çoxlu qoruqlar yaradıb. Sayı azalan, nəsli kəsilməkdə olan canlıların şəkilləri və adları Azərbaycanın **«Qırmızı kitab»**ına salınıb. Adı bu kitaba düşmüş canlıya toxunmaq olmaz. Üz qabığı «Qadağandır!» işarəsini bildirən qırmızı rəngdə olduğundan bu kitaba «Qırmızı kitab» deyirlər.



«Qırmızı kitab»a düşmüş bəzi heyvan və quşlar

**B** Təbiətin qoynuna gəzintiyə çıxarkən diqqətli olmalıyıq. Çünki ayağımızın altında canlılar qala bilər. Bəlkə də bilmədən tapdaladığımız həmin canlı adı «Qırmızı kitab»a düşmüş canlılardan biridir. Ona görə də gəzinti zamanı cığırlarla hərəkət etməliyik.

Bəzi canlıları narahat etməmək üçün meşədə səs-küy salmamalıyıq.

**YOXLAMA SUALLARI**

1. «Qırmızı kitab» nə üçündür?
2. Görəsən, təbiəti qorumasaq nə baş verər?
3. Yaşadığımız ərazidə hansı qoruq var? Orada hansı canlılar qorunur?





# ÇALIŞMALAR



Doğru cavabı qeyd edin.

**1.** Hansı canlıların adları «Qırmızı kitab»a düşüb?
A) Daha gözəl görünənlərin
B) Bizim ölkədə olmayanların
C) Nəsli kəsilməkdə olanların

**2.** Yuvada körpə quşcuğaz görsən nə edərsən?
A) Götürüb tüklərini sığallayaram
B) Qorxutmamaq üçün oradan uzaqlaşaram
C) Bəsləmək üçün evə gətirərəm

**3.** Dağ qoyunlarının azalmasının səbəbi nə ola bilər?
A) Qayalardan uçub tələf olmaları
B) Yeməyə ot tapmamaları
C) İnsanların onları ovlamaları

**4.** Qoruqlar nə üçün yaradılır?
A) Mal-qara otarmaq üçün
B) Bitkiləri, heyvanları və quşları qorumaq üçün
C) İstirahət etmək üçün

**5.** Qarğanın adı nə üçün «Qırmızı kitab»a **salınmayıb**?
A) Rəngi qara olduğuna görə
B) Sayı çox olduğuna görə
C) Qarıldadığına görə

## 18-ci dərs   *Zoopark (heyvanat parkı).*

**İNTERAKTİV SUALLAR**



1. Vəhşi heyvanlar haqqında nə bilirsiniz?
2. Şəkillərdəki heyvanlardan hansıları tanıyırsınız?
3. Zooparkda olmusunuzsa, orada hansı heyvanları görmüsünüz?


Fil


Zürafə


Kenquru

**A**

Biz vəhşi heyvanların çoxunu, adətən, fotoşəkillərdə və televizor ekranlarında görürük. Onları təbiətdə görməyimiz asan deyil, çünki vəhşi heyvanlar insanlardan uzaq gəzirlər. Onlar ova çox vaxt gecələr çıxırlar.

Şəkildə gördüyümüz heyvanlar isə uzaq ölkələrdə yaşayırlar. İnsanları belə heyvanlarla tanış etmək üçün zoopark (heyvanat parkı) yaradırlar. Təhlükəsizliyi təmin etmək üçün heyvanları zooparkda dəmir qəfəslərdə saxlayırlar.


Aslanlar (şirlər)


Pələng


Timsah



**B**

Ölkəmizdə cəmi bir zoopark var. O da Bakıda yerləşir. Bakı zooparkında meşələrimizdə, çöllərimizdə, çaylarımızda, dağlarımızda yaşayan heyvanlarla yanaşı, digər ölkələrdən gətirilmiş heyvanlar da saxlanılır. Zooparkda adı Azərbaycanın «Qırmızı kitab»ına düşmüş bəzi heyvanları da görmək olar.

Zooparkdakı qəfəslərin qarşısı həmişə heyvanlara maraqla tamaşa edən məktəblilərlə dolu olur.


Ceyran





Maral


Ayı


Berkut


Emu


Dəvə


Qutan


Cüyür

**YOXLAMA SUALLARI**



1. Zoopark nə üçün yaradılır?
2. Burada heyvanları nə üçün qəfəslərdə saxlayırlar?
3. Yuxarıda gördüyünüz heyvanlardan hansı ev heyvanıdır?

## ÇALIŞMALAR



Şəkildəki yırtıcı heyvanları tapın və onların adlarını boş sətirlərə yazın.





# IV bölüm





# MƏKAN, ZAMAN, HƏRƏKƏT





**19-cu dərs**

# *Yerin səthi. Okeanlar və materiklər.*

**İNTERAKTİV SUALLAR**



1. Okeanlar haqqında nə bilirsiniz? Hansı okeanları tanıyırsınız?
2. Materiklər haqqında nə bilirsiniz? Hansı materikləri tanıyırsınız?
3. Səhralar haqqında nə eşitmisiniz?






Yer səthi sudan və qurudan ibarətdir. Su onun daha çox hissəsini tutur. Yer səthinin su olan hissəsi okeanlardan, dənizlərdən, göllərdən və çaylardan ibarətdir. Planetimizdə dörd **okean** var: **Sakit okean**, **Hind okeanı**, **Atlantik okean** və **Şimal Buzlu okeanı**. Dənizlərin və göllərin sayı daha çoxdur: Xəzər dənizi, Qara dəniz, Qırmızı dəniz, Sarı dəniz, Aralıq dənizi, Göygöl, Baykal gölü, Balxaş gölü və s.

Yerin quru hissəsi altı böyük hissədən — **materikdən** və çoxlu adadan ibarətdir. Materiklər bunlardır: **Avrasiya**, **Afrika**, **Şimali Amerika**, **Cənubi Amerika**, **Avstraliya** və **Antarktida**.

Planetimizin quru səthində dağlıq, düzənlik, çökəkliklər var. Bu ərazilərdə meşəlik, çəmənlik və səhralarla yanaşı, buzlaqlar da var. Ən böyük buzlaqlar Şimal Buzlu okeanında və Antarktidadadır.






***Yadda saxlayın*** Azərbaycanın ən uca zirvələri Bazardüzü və Şahdağ, ən böyük düzənlikləri isə Mil və Muğandır.

# ÇALIŞMALAR



Doğru cavabı qeyd edin.

**1.** Hansı daha böyükdür?
A) Dəniz
B) Göl
C) Okean

**2.** Azərbaycan aşağıdakılardan hansının sahilində yerləşir?
A) Qara dənizin
B) Xəzər dənizinin
C) Ağ dənizin

**3.** Dağın ən aşağı hissəsi necə adlanır?
A) Yamac
B) Yarğan
C) Ətək

**4.** Aşağıdakılardan hansında ada ola bilər?
A) Dənizdə
B) Meşədə
C) Düzənlikdə

**5.** Zirvələrdən hansı ölkəmizin ərazisində **yerləşmir**?
A) Qoşqar
B) Kəpəz
C) Elbrus



## *20-ci dərs* — *Məkan.* *



**İNTERAKTİV SUALLAR**

1. Sinfinizin pəncərəsindən baxanda nələri görürsünüz?
2. Bəs, məktəbin həyətində olsaydınız nələri görərdiniz?
3. «Məkan» dedikdə nə başa düşürsünüz?





**A**

Biz təbiətdə müxtəlif varlıqlarla rastlaşırıq. Onların hər birinin **məkan** adlanan yeri var. Yuxarıdakı şəkillərdə qartalın balası qayalıqda, kombayn zəmidə, avtomobil isə yoldadır. Birinci halda məkan qayalıq, ikinci halda zəmi, üçüncü halda isə yoldur.

Gördüyümüz partalar, yazı taxtası və şkaf sinif otağı adlanan məkandadır. Əgər biz şəhərin içində hündür binaların əhatəsindəyiksə, uzaqları görə bilmirik. Binalar buna mane olur. Belə məkan **qapalı məkan** adlanır.

Əgər biz açıq yerdə, məsələn, düzənlikdəyiksə hər yanı maneəsiz görəcəyik. Belə məkan **açıq məkan** adlanır.


Qapalı məkan


Açıq məkan


Qapalı məkan


Açıq məkan

**B** Göydəki varlıqların da öz məkanı var. Günəş, Ay, planetlər və ulduzların yerləşdiyi məkan **kosmik məkan — kosmos** adlanır. Süni peyklər də kosmosda yerləşir.



Kosmik məkan

## YOXLAMA SUALLARI

1. Qapalı məkanlara aid daha hansı misalları göstərə bilərsiniz?
2. Dənizdəki qayıq hansı məkandadır: açıq, yoxsa qapalı?
3. Kosmik məkandakı varlıqlardan hansıların adlarını söyləyə bilərsiniz?





***Yadda saxlayın*** İlk dəfə kosmosda olmuş insan **Yuri Qaqarindir.**



# ÇALIŞMALAR



Krossvordu həll edin.

1. Şəhər içərisində yol.
2. Dağın ən hündür yeri.
3. Piyadaların yolu.
4. Böyük su arxı.
5. Pambıq əkilən yer.
6. Taxıl əkilən yer.
7. Şəhərdə istirahət yeri.



# 21-ci dərs — Zaman və onun ölçülməsi.

**İNTERAKTİV SUALLAR**



1. Birinci sinfə gəldiyiniz ilk gün necə yadınızda qalıb?
2. O gündən indiyədək neçə ay keçib?
3. Neçə aydan sonra yay tətilinə çıxacaqsınız?
4. Neçə ildən sonra məktəbi bitirəcəksiniz?


Çağa


Uşaq


Şagird


Gənc


Qoca

**A**

Bir vaxt biz çağa idik. Danışmaq, yerimək, oxumaq, yazmaq bilmirdik. Böyüdükcə yavaş-yavaş bunların hamısını öyrəndik. İndi artıq ikinci sinifdə oxuyuruq. Doğulduğumuz vaxtdan indiyə qədər xeyli zaman keçib. Həmin zamanı ölçmək olar. İnsanlar zamanı illə, ayla, günlə, saatla ölçürlər.

Bu günə qədər keçən vaxt **keçmiş zamandır**. Bu sətirləri oxuduğumuz vaxt **indiki zamandır**. Bundan sonra olacaq vaxt isə **gələcək zamandır**.



**B**

Keçmiş zamanlarda insanlar yalnız gecə və gündüzü sayırdılar. Sonra Günəşin və Ayın hərəkətini öyrənib, ili aylara, ayları günlərə, günləri saatlara böldülər. Beləliklə, onlar təqvim yaratdılar. Təqvim ili, ayı, həftəni və günü göstərir.

Adamlar zamanı ölçmək üçün xüsusi cihazlar — saatlar ixtira ediblər. Ən qədim saat günəş saatıdır. Sonralar insanlar qum saatı, əqrəbli saat, elektron saat icad etdilər. Saat işlərini planlaşdırmaqda və vaxtı dəqiqləşdirməkdə insanlara kömək edir.


Günəş saatı


Qum saatı


Divar saatı


Zəngli saat


Qol saatı



Elektron saat

1 il=12 ay

1 həftə=7 gün

1 gün=24 saat

1 saat=60 dəqiqə




**Həftənin günləri**

1. Bazar ertəsi
2. Çərşənbə axşamı
3. Çərşənbə
4. Cümə axşamı
5. Cümə
6. Şənbə
7. Bazar

**YOXLAMA SUALLARI**



1. Keçmiş zaman, indiki zaman və gələcək zaman dedikdə nə başa düşürsünüz?
2. Saatın insanlara nə faydası var?
3. 1 həftə 5 gün neçə **gündür**?



***Yadda saxlayın*** Zamanı geri qaytarmaq olmaz. Ona görə də onun qədrini bilmək lazımdır!

# ÇALIŞMALAR



Şəkillər əsasında **«Atların sonrakı ağlı»** adlı hekayə qurub nəql edin.








## Hər şey hərəkət edir.*

**İNTERAKTİV SUALLAR**



1. «Hərəkət» dedikdə nə başa düşürsünüz?
2. Yerin hərəkəti haqqında nə deyə bilərsiniz?
3. Ayrı-ayrı varlıqların bir məkandan başqa məkana yerlərini dəyişməsini hansı sözlərlə ifadə etmək olar?

1 

2 

3 

4 

5 

6 

7 

**A** Təbiətdəki bütün varlıqlar **hərəkət** edir. Lobya torpaqdan boy atıb böyüyür (*şəkil 1*). Qartal şığıyır (*şəkil 2*). Pələng tullanır (*şəkil 3*). Atlar çapır (*şəkil 4*). Balıqlar üzür (*şəkil 5*). İlan sürünür (*şəkil 6*). İnək otlayır (*şəkil 7*). Çayların suyu axır. Külək əsir.



***Yadda saxlayın*** Təbiətdə hər şey hərəkətdədir.









**B**

Bəzi varlıqlar özləri hərəkət edir, bəzilərini isə başqaları hərəkət etdirirlər. Quş özü uçur. Fırfıranı külək, velosipedi isə insan hərəkətə gətirir (*şəkil 9, 10*).

Varlıqların hərəkəti müxtəlif cür olur. Qatar **düzxətli hərəkət** edir (*şəkil 8*). Velosipedin təkəri **öz oxu ətrafında** fırlanır (*şəkil 10*). Kosmik peyk isə Yerin ətrafında **dairəvi hərəkət** edir (*şəkil 11*).



## YOXLAMA SUALLARI

1. Yerin Günəş ətrafında dövr etməsi hansı hərəkətdir?
2. 12-ci şəkildəki varlıqlardan hansılar özləri hərəkət edə bilir?
3. Özü hərəkət edə bilməyən hansı varlıqları göstərə bilərsiniz?





# ÇALIŞMALAR



Şəkillər üzrə araşdırma aparın. Sualların cavablarını boş sətirlərə yazın.

1. Gördüklərinizdən biri yalnız yeriməklə hərəkət edir. Onun adı nədir?

_______________

2. Gördüyünüz quşlardan biri uça bilmir. Yerimək lə və üzməklə hərəkət edir. Onun adı nədir?

_______________

3. Heyvanlardan biri yerimək lə, hoppanmaqla və üzməklə hərəkət edir. Onun adı nədir?

_______________

4. Heyvanlardan biri quş kimi uçmaqla hərəkət edir. Onun adı nədir?

_______________



















# 23-cü dərs Üfüq və onun cəhətləri.*

**İNTERAKTİV SUALLAR**



1. Nə vaxtsa meşədə və ya şəhərdə yolu azmısınızmı? Bu zaman vəziyyətdən necə çıxmısınız?
2. «Təyyarə üfüqdə göründü» sözlərinin mənasını necə başa düşürsünüz?



1

**A** Açıq yerdə ətrafımıza diqqətlə baxaq. Uzaqlarda yerin sanki göylə bir xətt üzrə birləşdiyini görərik (*şəkil 1*). Yerin bu xəttə qədər gördüyümüz hissəsi **üfüq**, həmin xətt isə **üfüq xətti** adlanır.

Üfüq xəttinə gedib çatmaq mümkün deyil. Əgər biz irəli getsək, üfüq xətti sanki geri çəkilib bizdən uzaqlaşacaq.

Üfüqün dörd əsas cəhəti var: şimal (Şm), cənub (C), şərq (Ş) və qərb (Q). Bunlardan başqa dörd aralıq cəhət var: şimal-qərb (ŞmQ), şimal-şərq (ŞmŞ), cənub-qərb (CQ), cənub-şərq (CŞ). Üfüqün cəhətlərini **kompas** adlanan cihazla müəyyən etmək olur (*şəkil 2*). Kompasla cəhətləri istənilən havada, gecə və gündüz müəyyən etmək olar. Kompas dənizçilərin, təyyarəçilərin və səyyahların ən yaxın köməkçisidir.



2

Kompas





Səyyah kompası



Hərbçi kompası



Elektron kompas

**B** Hər bir şəxs üfüqün cəhətlərini müəyyən etməyi bacarmalıdır. Bunun üçün diqqətli olmaq və təbiətdəki bəzi şeylərə fikir vermək lazımdır. Məsələn, tənha ağacların şimal tərəfdəki budaqları qısa, cənub tərəfdəki budaqları isə uzun olur (*şəkil 3*). Açıqlıqdakı iri daşların, qayaların və ağacların şimal tərəfini mamır örtür. Qarışqalar yuvalarını ağac kötüyünün cənub tərəfində qururlar.

Günorta arxamızı Günəşə tərəf çevirsək, kölgəmizin baş tərəfi şimalı, ayaq tərəfi cənubu, sağ tərəfi şərqi, sol tərəfi isə qərbi göstərəcək (*şəkil 4*).

3




4




**YOXLAMA SUALLARI**

1. Üfüqün cəhətlərini nəyə görə bilmək lazımdır?
2. Kompasın faydası nədir?
3. Cəhətləri hansı təbii əlamətlərə görə təyin edə bilərsiniz?



## ÇALIŞMALAR



Şəklə diqqətlə baxın. Kompasda əsas və aralıq cəhətləri qeyd edin. Şərqdəki ilanı yaşıl, qərbdəki qartalı qara, cənub-şərqdəki fili qəhvəyi rəngləyin.








## Rəsm və plan.*

### İNTERAKTİV SUALLAR



1. «Həyat bilgisi» kitabınızın eni və uzunluğu neçə santimetrdir?
2. Varlığın rəsminə görə onun ölçülərini müəyyən etmək olarmı? Niyə?

**A**

Səhifənin sağ tərəfindəki rəsmlərə baxaq. Bunlar hamımızın yaxşı tanıdığımız kubik-rubik (*şəkil 1*) və kibrit qutusudur (*şəkil 2*).

Rəsmə baxmaqla varlıqları asanlıqla tanımaq olur, lakin onun ölçülərini müəyyən etmək olmur. Bunun üçün onların planını çəkmək lazım gəlir.

**Plan** varlığın sanki yuxarıdan görünüşüdür.

Kiçik varlıqların, məsələn, 2-ci şəkildəki kibrit qutusunun planını çəkmək o qədər də çətin deyil. Bunun üçün onu ağ kağız üzərinə qoyub kənarı boyu xətt çəkək. Dördbucaqlı (düzbucaqlı) alacağıq (*şəkil 3*). Bu, kibrit qutusunun planıdır. Plandakı ölçülər isə onun həqiqi ölçüləridir.










Kibrit qutusunun planı

**B** Kibrit qutusundan fərqli olaraq stulun planını çəkmək daha çətindir. Bunun üçün əvvəlcə stulun ölçülərini müəyyən etmək lazımdır. Tutaq ki, onun üst hissəsi tərəfi 40 sm olan kvadratdır. Kibrit qutusundan fərqli olaraq, tərəfi 40 sm olan kvadratı qarşımızdakı kağız vərəqində yerləşdirmək mümkün deyil. Ona görə də stulun ölçülərini 10 dəfə kiçildək və vərəq üzərində tərəfi 4 sm olan kvadrat çəkək. Bu, stulun planı olacaq (*şəkil 5*).

Stulun planını çəkərkən biz **miqyasdan** istifadə etdik. Onu belə yaza bilərik: 1 sm — 10 sm. Bu o deməkdir ki, plandakı 1 sm stulun həqiqi ölçüsünün 10 sm-nə bərabərdir.

Miqyasdan xəritə çəkəndə də istifadə olunur.

4



Stulun rəsmi

5

Miqyas: 1 sm — 10 sm




Stulun planı



***Yadda saxlayın*** Miqyas əşyanın həqiqi ölçülərinin planda neçə dəfə kiçildildiyini (böyüdüldüyünü) göstərir.

**YOXLAMA SUALLARI**

1. Plan nədir?
2. Kibrit qutusunun planını necə çəkdik?
3. Bəs, stulun planını çəkmək üçün nə etdik?





# ÇALIŞMALAR



Hər bir əşyanın rəsmini onun planı ilə birləşdirin.

























## 25-ci dərs  Ərazinin planı. Xəritə.*

**İNTERAKTİV SUALLAR**



1. Məktəbimizin üzü hansı səmtə baxır?
2. Məktəbimizin yaxınlığında hansı tikililər var?
3. «Xəritə» dedikdə nə başa düşürsünüz?


Ərazinin fotosu


Ərazinin planı


Ərazinin fotosu


Ərazinin planı


Qəsəbənin fotosu


Qəsəbənin planı

**A** Varlıqlar kimi, ayrı-ayrı ərazilərin, kəndlərin və şəhərlərin də planını çəkmək olar. Yəqin ki, siz hansısa evin və ya məktəbin harada yerləşdiyini kiməsə başa salmısınız. Ola bilsin ki, hətta ora gedən yolu kağız üzərində çəkib göstərmisiniz. Bunun özü də ərazinin planıdır. Böyük ərazilərin planını dəqiq çəkmək üçün təyyarələrdən, vertolyotlardan, kosmik peyklərdən istifadə olunur. Bunun üçün həmin ərazinin yuxarıdan fotoşəkli çəkilir, sonra isə onun əsasında plan hazırlanır.





**Şərti işarələr**

— dövlət sərhədi
— paytaxt
— şəhərlər
— göllər və su anbarları
— çaylar
— adalar




**B** İnsanlar planla yanaşı **xəritələrdən** də istifadə edirlər. Xəritə yer səthinin şərti işarələrin köməyi ilə kağız üzərində kiçildilmiş təsviridir. Xəritədən istifadə etmək üçün gərək onu oxumağı bacaraq. Bunun üçünsə xəritədəki şərti işarələri yaxşı bilmək lazımdır.

**YOXLAMA SUALLARI**

1. Bakı şəhəri ölkəmizin hansı tərəfindədir? Bəs, Lənkəran?
2. Gürcüstan Respublikası ölkəmizin hansı tərəfindədir?
3. Araz çayı Kür çayına hansı şəhərin yaxınlığında birləşir?



## ÇALIŞMALAR



Aşağıdakı şəkildən sinif otağınızdakı partaların düzülüş planını ayırın. Oturduğunuz partanı qırmızı karandaşla rəngləyin.

Parta



# V bölüm





# VƏTƏNİMİZ, SƏRVƏTLƏRİMİZ





## 26-cı dərs

# Yeraltı xəzinə – faydalı qazıntılar.

### İNTERAKTİV SUALLAR



1. Partanızın hazırlanmasında hansı materiallardan istifadə olunub? Həmin materiallar haradan alınır?
2. «Xəzinə» sözünün mənasını necə başa düşürsünüz?
3. Sizcə, nələri «yeraltı xəzinə» adlandırmaq olar?



Faydalı qazıntılardan düzəldilən süni varlıqlar «ağacı»

**A** Hər gün istifadə etdiyimiz varlıqların bir çoxunu insanlar yaradıb. Ona görə də belə varlıqlara süni varlıqlar deyirik. İnsanlar süni varlıqları yaratmaq üçün müxtəlif materiallardan istifadə edirlər. Məsələn, evin tikintisi üçün daş, kərpic, mərmər, qum, su, dəmir və taxta işlədilir. Bu materiallar **təbii ehtiyatlardır**. Təbii ehtiyatların bir hissəsi yerin üstündə, bir hissəsi isə yerin altında olur. Yerdən çıxarılan təbii ehtiyatlara **faydalı qazıntılar** deyilir.



**B** Vətənimizdə çoxlu faydalı qazıntılar var. Bakı ətrafında, Xəzər dənizində, Əli Bayramlıda, Siyəzəndə neft və qaz, Daşkəsəndə dəmir, mərmər və alunit, Gədəbəydə qızıl və mis, Naxçıvanda qızıl, gümüş və duz çıxarılır.

Ölkəmizin digər yerlərində də faydalı qazıntılar var. Kəlbəcərdə qızıl və gümüş, Balakəndə müxtəlif metal yataqları yerləşir. Bunların hamısı Vətənimizin yeraltı xəzinələridir. Onlardan yaxın gələcəkdə istifadə olunacaq.



Neft quyusu



Qaz platforması



Mərmər



Gümüş



Zümrüd



Daş kömür



Duz



Qızıl



Almaz

### YOXLAMA SUALLARI

1. Vətənimizdə hansı faydalı qazıntılar var?
2. Faydalı qazıntılardan nə üçün qənaətlə istifadə olunmalıdır?
3. Faydalı qazıntılara nə üçün «yeraltı xəzinə» deyirlər?
4. Neft məhsullarından hansıları tanıyırsınız?



# ÇALIŞMALAR



Doğru cavabı qeyd edin.

**1.** Aşağıdakılardan hansı Azərbaycanı dünyada ən çox tanıdan faydalı qazıntıdır?

A) Qızıl
B) Gümüş
C) Neft

**2.** Ölkəmizdə ən çox neft və qaz harada çıxarılır?

A) Siyəzəndə
B) Xəzər dənizində
C) Əli Bayramlıda

**3.** Aşağıdakılardan hansı faydalı qazıntıdır?

A) Duz
B) Yerkökü
C) Kartof

**4.** Aşağıdakılardan hansı faydalı qazıntı **deyil**?

A) Mərmər
B) Taxta
C) Dəmir

**5.** Pozan nədən hazırlanır?

A) Dəridən
B) Pambıqdan
C) Neftdən



## 27-ci dərs *Kəndimiz (şəhərimiz). İlisu.*

### İNTERAKTİV SUALLAR



1. Kəndimizin (şəhərimizin) adı nədir? Bu ad haradan götürülüb?
2. Onun tarixi abidələrindən hansılarını tanıyırsınız?
3. Yaşadığımız yerdə hansı məhəllələr var?



İlisudan bir mənzərə



Şəlalə

**A** Doğma Azərbaycanın çoxlu kəndləri, qəsəbələri, şəhərləri var. Onlardan biri də bizim kəndimiz İlisudur. İlisu uca dağların qoynunda, Kürmük çayının sahilində yerləşir. Babalarımızın dediyinə görə, kəndimiz adını yaxınlıqda çıxan ılıq sulardan götürüblər. İlisunun başı qarlı dağları, dumduru bulaqları, gözəl şəlalələri hamını valeh edir. Meşələrimizdə cürbəcür ağaclar, yaylaqlarımızda al-əlvan çəmənliklər var. Dağlarımızda ayı, dağ keçisi və başqa vəhşi heyvanlar yaşayır. Kəndimizin qışı soyuq, yayı isə sərin olur. Yayda bura istirahətə çoxlu qonaqlar gəlir. Onlar Səngər bulağın, Beşbulağın sərin sularından içməyi çox sevirlər.

**B** Ulu körpü, Sumuq qala, Şamilin qalaçası, Bürc və Məscid İlisunun qədimliyini göstərir. Biz bu tarixi abidələrimizi göz bəbəyi kimi qoruyur və fəxrlə qonaqlarımıza göstəririk. Kəndimizdə məktəb, poçt, mağazalar və yeməkxanalar da var.

İlisuda insanlar daha çox heyvandarlıqla məşğul olurlar. İlisuluların hazırladıqları dadlı yeməklər, sarı çiçəkli pendir hər yanda məşhurdur. Kəndimizi ən çox tanıdan isə onun alimləridir. İlisuda oxumağı, bilik öyrənməyi çox sevirlər. Ona görə də İlisu dünyada ən çox alim yetişdirən kənd kimi tanınır. Alimlərimizin yaratdıqlarından bütün sahələrdə istifadə olunur. Bilik əldə etdiyimiz bir çox kitabları da onlar yazıblar.


Məscid


Şamilin qalaçası


Sumuq qala


Ulu körpü


Beşbulaq


Bürc

### YOXLAMA SUALLARI



1. Kəndimizdən (şəhərimizdən) keçən yol(lar) hara gedir?
2. Kəndimizdən (şəhərimizdən) keçən çay haradan başlayır?
3. Günəş kəndimizdə (şəhərimizdə) haradan çıxır, harada batır?
4. Tarixi abidələri nəyə görə qorumalıyıq?



## ÇALIŞMALAR



«AZƏRBAYCAN» krossvordunu həll edin. Tapdığınız sözləri səhifənin aşağısındakı xəritədə uyğun rəqəmlərin yanında yazın.

1. Paytaxtımız.
2. Dənizimiz.
3. Böyük çayımız.
4. İkinci böyük çayımız.
5. Ümummilli liderimizin anadan olduğu şəhər.
6. İkinci böyük şəhərimiz.






# 28-ci dərs — İqtisadiyyat.*

## İNTERAKTİV SUALLAR



1. «Təsərrüfat» dedikdə nə başa düşürsünüz?
2. Yaşadığımız ərazidə hansı kənd təsərrüfatı məhsulları istehsal olunur?
3. Yaşadığımız məntəqədə zavod, fabrik, kombinat, sex varmı? Onlar hansı məhsulları istehsal edirlər?

**A** Radiodan, televiziyadan tez-tez «iqtisadiyyat» sözü eşidirik. Böyüklər hər gün «iqtisadiyyatımız inkişaf edir» deyirlər. Bəs, iqtisadiyyat nədir?

İqtisadiyyat — ölkənin təsərrüfatıdır. Yəni ölkədəki kənd təsərrüfatı, sənaye, tikinti, nəqliyyat, ticarət və xidmət sahələri birlikdə iqtisadiyyatdır. Bunlar hamısı bir-biri ilə sıx əlaqəlidir. Məsələn, kənd təsərrüfatında bəslənən inəklərdən sağılan süd nəqliyyatla (avtomobillə) süd kombinatına göndərilir. Orada süddən yağ, qatıq, pendir, kəsmik və başqa ərzaqlar hazırlanıb, ticarət məntəqələrinə (mağazalara) yola salınır. Bu məntəqələrdə həmin ərzaqlar əhaliyə satılır.






**B** Ölkəmizdə iqtisadiyyatın müxtəlif sahələri var. Ən inkişaf etmiş sahə neft və qaz sənayesidir. Azərbaycan nefti dünyanın bir çox ölkəsinə göndərilir.

Kənd təsərrüfatımız da sürətlə inkişaf edir. Tarlalarımızda bol taxıl və pambıq, bağlarımızda cürbəcür meyvələr yetişir. Otlaqlarımızda çoxlu mal-qara bəslənilir.

Şəhərlərimizdə, kəndlərimizdə geniş tikinti işləri aparılır. Yeni yaşayış binaları, zavod və fabriklər tikilir. Yollar və körpülər salınır. Ölkəmizdə, demək olar ki, bütün nəqliyyat vasitələrindən istifadə edilir. Hava, dəniz, avtomobil və dəmiryolu nəqliyyatı yaşayış məntəqələrimizi bir-biri ilə, eləcə də xarici ölkələrlə birləşdirir. Şəhər və kəndlərimizdə ticarət məntəqələri — mağazalar, univermaqlar, marketlər fəaliyyət göstərir.


Kənd təsərrüfatı


Sənaye


Tikinti


Nəqliyyat


Ticarət

## YOXLAMA SUALLARI



1. İqtisadiyyatın hansı sahələrini tanıyırsınız?
2. Bu sahələr arasında nə kimi əlaqələr var?
3. Yaşadığımız ərazidə hansı ticarət məntəqələri var?

## 29-cu dərs — *Pul.*

### İNTERAKTİV SUALLAR



1. Sizcə pul nəyə lazımdır?
2. Pullar nələrdən düzəldilir?
3. Hansı ölkələrin pullarını tanıyırsınız? Onların adlarını sadalayın.



**A**

Yemək üçün, geyinmək üçün, ev, maşın, mebel almaq üçün insanlara pul lazım olur. Pulu isə yalnız gördüyün işlərin əvəzində qazana bilərsən. Nə qədər lazımlı və qiymətli iş görsən, bir o qədər çox pulun olar.

Pul olmayanda insanlar ayrı-ayrı şeyləri bir-birinə dəyişməklə alver edirdilər. Məsələn, bir çuval buğda almaq üçün əvəzində bir neçə qoyun verirdilər, balta almaq istəyən əvəzində bir çəpiş verirdi. Bu cür ticarət çətinlik törədirdi. Uzaq yerdən nəsə almaq istəyən özü ilə bir sürü heyvan, yaxud bir neçə araba meyvə aparmalı olurdu. Ona görə də insanlar daşınması asan olan pulu icad elədilər. Misdən, gümüşdən, qızıldan pul düzəltdilər. Üzərinə şahların, sultanların, xanların adlarını və şəkillərini vurdular. Lap sonralar isə gəzdirilməsi daha asan olan kağız pullar yarandı. İlk kağız pul Çində icad edilib.



**B**

Hər bir dövlətin öz pulu var. Amerikada əsas pul vahidi dollar, Türkiyədə lirə, Rusiyada rubl, Gürcüstanda lari, Qazaxıstanda tenqedir. Vətənimiz Azərbaycan qədim ölkə olduğundan, tarix boyu pullarımızın müxtəlif adları olub: şahı, abbası, dinar, tümən, manat. Onları misdən, gümüşdən, qızıldan, kağızdan düzəldiblər. Hazırda ölkəmizin əsas pul vahidi **manatdır. Qəpik** adlanan xırda metal pullarımız da var.

Pul dövlətin rəmzlərindən biridir. Ona görə də **pulları cırmaq, əzmək və çirkləndirmək olmaz!**





### YOXLAMA SUALLARI



1. Pul olmayanda insanlar necə ticarət edirdilər?
2. İnsanlar nəyə görə pul icad elədilər?
3. Pulu necə qazanmaq lazımdır?
4. Nəyə görə pulu cırmaq, əzmək, çirkləndirmək olmaz?

**30-cu dərs** | *Qənaət. Necə qənaətcil olaq?*

İNTERAKTİV SUALLAR



1. «Qənaətcil» və «israfçı» sözlərini necə başa düşürsünüz?
2. Qənaətcilliyin xəsisliklə fərqi nədir?
3. «Dama-dama göl olar» atalar sözünü necə başa düşürsünüz?



**A**

**Qənaətcillik** dedikdə vaxtdan, puldan, əşyalardan geyim və ərzaqdan düzgün istifadə etmək başa düşülür.

İşlərimizdə planlı hərəkət etsək, məqsədimizə daha asanlıqla çatarıq. Bunun üçün özümüzə gündəlik plan tutmalıyıq. Planda görəcəyimiz hər bir işə — oxumağa, yazmağa, oynamağa, istirahətə vaxt ayırmalıyıq. İşlərimizi görərkən ayırdığımız vaxtdan kənara çıxmamalıyıq. Bu, vaxta qənaətin ən yaxşı yoludur.

Pul asanlıqla qazanılmır. Valideynlərimiz qazandıqları pulun hər manatı üçün böyük zəhmət çəkir, alın təri tökürlər. Bu pullar ailələrimizin ehtiyaclarına sərf olunur. Ona görə də ehtiyaclarımızı ödəyərkən qənaətcil olmalı, lazımsız xərclərdən qaçmalıyıq. Pulumuzu ilk növbədə ən vacib olan şeylərə xərcləməliyik.



**B**

Gündəlik həyatımızda elektrik enerjisindən, qazdan, sudan istifadə edirik. Bunlara da qənaətlə yanaşmalıyıq. İşıqları boş yerə yandırmamalıyıq. Su kranını açıq qoymamalıyıq. Qaz plitəsinin, sobanın boş yerə yanmasına yol verməməliyik. Bunların hər birinə görə ailə büdcəmizdən pul ödəndiyini unutmamalıyıq.

Süfrə arxasında boşqabımıza yeyə biləcəyimiz qədər yemək qoymalıyıq. Dəftərlərimizi boş yerə yazıb doldurmamalı, qələmlərimizdən və digər dərs ləvazimatlarımızdan istifadə edərkən israfçılığa yol verməməliyik.

Geyimlərimizin sürtülməsinə, sökülməsinə, cırılmasına, çirklənməsinə səbəb olan lazımsız hərəkətlərdən qaçmalıyıq.


Suya qənaət edək!


Qaza qənaət edək!


Elektrik enerjisinə qənaət edək!


İsrafçı olmayaq!

YOXLAMA SUALLARI



1. Vaxta necə qənaət etmək olar?
2. Valideynlərinizin verdiyi pula necə qənaət edirsiniz?
3. Elektrik enerjisinə, suya və qaza necə qənaət etmək olar?
4. Qənaətcilliyin faydası nədir?

## ÇALIŞMALAR



Doğru cavabı qeyd edin.

**1.** Aşağıdakılardan hansı Azərbaycanda **becərilmir**?

A) Banan
B) Portağal
C) Şaftalı

**2.** Aşağıdakılardan hansı ölkəmizdə istehsal olunur?

A) «Jiquli» avtomobili
B) «Çinar» soyuducusu
C) Təyyarə

**3.** Hansı Azərbaycanın iqtisadiyyatına aid **deyil**?

A) Pambıq istehsalı
B) Qaz istehsalı
C) Daş kömür istehsalı

**4.** Aşağıdakılardan hansı Azərbaycan puludur?

A) Dollar
B) Manat
C) Lari

**5.** Aşağıdakılardan hansına qənaət etmək lazımdır?

A) Suya
B) Havaya
C) Küləyə



## *31-ci dərs* *28 May – Respublika Günü.*

**İNTERAKTİV SUALLAR**



1. Sizcə, bayram nə deməkdir? Bayram günü başqa günlərdən nə ilə fərqlənir?
2. Hansı bayramlarımızı tanıyırsınız?
3. «Respublika Günü» haqqında nələri bilirsiniz?









**A** Hər bir xalqın sevincli günləri — bayramları olur. Bizim də belə günlərimiz var: «Yeni il bayramı», «Qadınlar bayramı», «Novruz bayramı» və s.

Bayram sevinc, şadlıq, mehribanlıq, birlik deməkdir. Bayramda insanlar bir-birini təbrik edir, sevinclərini bölüşürlər. Bütün bayramlarımız bizə əzizdir. Onların hər birini sevinc və iftixar hissi ilə keçiririk. Bayramlarımızın arasında **«Respublika Günü»** xüsusi yer tutur. Xalqımız hər il mayın 28-ni böyük təntənə ilə qeyd edir. Kəndlər, şəhərlər üçrəngli bayrağımızla bəzədilir. Hər yerdə yığıncaqlar keçirilir, himnimiz oxunur, bayram konsertləri verilir. Əsgərlərimiz yürüş keçirir. Paytaxtımızda atəşfəşanlıq olur.

**B**

28 May gününü niyə bayram edirik? Ona görə ki, min doqquz yüz on səkkizinci ilin həmin günündə babalarımız müstəqil dövlətimizi qurublar. O vaxtdan çox illər keçib. İndi Azərbaycanımız çiçəklənən, demokratik bir ölkəyə çevrilib.

Azərbaycanımızda uşaqların sağlam, bilikli və tərbiyəli böyümələrinə böyük diqqət yetirilir. Çünki gələcəkdə Vətənimizi idarə etməyi bizə tapşıracaqlar. Ona görə də yaxşı oxumalı və özümüzü buna hazırlamalıyıq. Axı, gələcək bilikli insanlarındır!




### YOXLAMA SUALLARI



1. 28 May gününü niyə bayram edirik?
2. Respublika Günü məktəbimizdə necə qeyd olunur?
3. Bayram günlərində televiziya verilişlərində, qəzetlərdə hansı dəyişiklikləri müşahidə edirsiniz?



## ÇALIŞMALAR



Palıd yarpaqlarını, sünbülləri və məşəli gerbimizdəki rənglərə uyğun karandaşlarla rəngləyin.







***Yadda saxlayın*** Gerbimizdəki palıd budağı uzunömürlülük rəmzidir.





***Yadda saxlayın*** Gerbimizdəki sünbüllər bolluq və bərəkət rəmzidir.





***Yadda saxlayın*** Gerbimizdəki məşəl Azərbaycanın odlar yurdu olduğunu bildirir.

# 32-ci dərs — *Tətilə gedirik.*

**İNTERAKTİV SUALLAR**



1. Tətilinizi harada və necə keçirməyi planlaşdırırsınız?
2. «Həyat bilgisi»ndən öyrəndiklərinizi unutmamaq üçün nə etməlisiniz?
3. Tətildə ailənizə hansı işlərdə kömək edəcəksiniz?



**A** Bir dərs ilinin də sonuna gəldik. Oxuduq, öyrəndik, bilik və bacarıqlarımızı xeyli artırdıq. İndi isə tətilə çıxmaq, dincəlmək vaxtı çatıb. Tətilin əvvəlini Novxanıdakı bağımızda keçirəcəyəm. Əmim oğlu Ayxanla dənizdə çimib, narın qumda uzanaraq bədənimi qaraldacağam. Sonra atam bacımla məni Şəkinin Göynük kəndinə aparacaq. Orada atamın dostu Vaqif əmi yaşayır. Tətilin bir hissəsini də onlarda keçirəcəyəm. Vaqif əmi bizi yaylağa aparmağa söz verib. Yaylaq zirvəyə yaxın olduğundan, onun quzeyində yayda da qar qalır. Orada herbari üçün dağ çiçəkləri toplayacağam. Dostum Azər Ceyrançöldən yovşan və çöl çiçəkləri gətirəcək. Biz yığdığımız nümunələrdən herbari düzəldəcəyik. Herbarilərimizi gələn dərs ilində məktəb sərgisində nümayiş etdirəcəyik.



**B** Müəllimimiz tətillə bağlı bizə xeyli məsləhət verib. Onlardan bəzilərini dəftərimə qeyd etmişəm:

— *Tətili faydalı keçirmək üçün hava, bulaq suyu və günəşdən yararlanın. Sağlam böyüməyiniz üçün bunlar çox lazımdır.*

— *Müxtəlif oyunlar oynayın, televizorda uşaq proqramlarına baxın.*

— *Öyrəndiklərinizi unutmamaq üçün təkrarlayın.*

— *Bilgilərinizi artırmaq üçün yeni kitablar oxuyun, məsələlər, misallar həll edin.*

— *Ailənizə kömək etməyi unutmayın. Yaşınıza və gücünüzə uyğun işlərdə onlara kömək edin.*





***Yadda saxlayın*** Tətil — istirahət etmək və məktəbdə daha yaxşı oxumağa hazırlaşmaq üçün verilən vaxtdır.

## ÇALIŞMALAR



Sıraların hər birinin nizamını pozan xananı tapıb üstündən xətt çəkin. Qərarınızı izah edin.

















MÜNDƏRİCAT



**Zahid İbrahim oğlu Qaralov**
**Əlövsət Cəlal oğlu Osmanlı**
**Fikrət Süleyman oğlu Əhmədov**
**Vüqar Firudin oğlu Məmmədov**

**HƏYAT BİLGİSİ**

*Ümumtəhsil məktəblərinin 2-ci sinfi üçün*

*Texniki redaktoru*: **Güləndam Gültəkin**
*Rəssamı*: **Hikmət Qəhrəmanov**

Çapa imzalanıb: 09.08.2005.

**«Pedaqogika»** nəşriyyatı.
Bakı, S.Rəhimov küç., 108.

